**Əli ibn Abdu`r-RAHMAN əl-HUZEYFİ**

# TÖVBƏNİN ƏHƏMİYYƏTİ

www.islamevi.az

SIRAT YAYINLARI

# TÖVBƏNİN ƏHƏMİYYƏTİ

Tövbələri qəbul və çoxlu mərhəmət edən, hər şeyi bilən və hikmət sahibi olan ALLAH`a həmd olsun. RƏBB`imə həmd və şükr edirəm. Ona tövbə edir və Ondan bağışlanma diləyirəm. Şəhadət edirəm ki, ALLAH`-dan başqa ibadətə və itaətə layiq haqq ilah yoxdur. O, Təkdir və şəriki yoxdur. Şəhadət edirəm ki, Peyğəmbərimiz Muhəmməd Onun qulu və Rəsuludur, böyük əxlaq sahibidir. ALLAH`ım! Qulun və Rəsulun Muhəmmədə, əhli beytinə və əshabına, onların doğru yolunda gedənlərə xeyir-dua və salam elə!

Bundan sonra... ALLAH`dan layiqincə qorxun, ey ALLAH`ın qulları! Ona tövbə edin və Ondan bağışlanma diləyin ki, savablarınızı çoxaltsın və günahlarınızı bağışlasın. Ey müsəlmanlar! İnsanın ən fəzilətli halı və ən qüsursuz sifəti, sevdiyi və razı olduğu, bəyənmədiyi və qəzəbləndiyi şeylərdə ALLAH`a ﷻ

tabe olmasıdır. Beləcə qul, RƏBB`inin sevdiyini sevər və yaradıcısının bəyənmədiyinə də qəzəblənər. Sevdiyi və razı olduğu şeylərdə ALLAH`a عز وجل tabe olmaq, Ona عز وجل qarşı edilən asiliyi bəyənməmək, ancaq hər cür qüsur və günahdan səhih bir tövbə etməklə, ALLAH`a عز وجل itaətdə doğru olmaqla və haramlardan uzaq durmaqla olur. Səhih tövbə, ibadət edənlərin məqamlarının ən ucasıdır. Möminlərin hallarının ən şərəflisi və təqva sahiblərinin itaətlərinin məqsədidir.

Hidayət Peyğəmbəri ﷺ, tövbəyə işarə edərək tərif etmiş və tövbənin, qulun həyatında müvəffəqiyyətli edildiyi ən xeyirli şey olduğunu bildirmişdir. Ka`b ibn Malikdən رضي الله عنه bu hədisi rəvayət edir: Rəsulullah ﷺ, Kə`b رضي الله عنه Təbuk Savaşına getmədiyi zaman ALLAH`ın عز وجل onun tövbəsini qəbul etdiyini bildirərək belə buyurur:

*"Anan səni doğduğundan bəri olduğun ən xeyirli gün ilə sevin."*

Kə`b ﷺ belə deyir: "İnsanlar dəstə-dəstə məni qarşıladılar. Tövbəmə görə məni təbrik edir və mənə "ALLAH`ın tövbəni qəbul etməsi mübarək olsun" deyirdilər."[1]

ALLAH ﷻ, bu ümmətdən hər cür insana, xeyirlərlə önə keçənlərə, ibadətlərdə mötədil davrananlara və haramlarla nəfslərinə zülm edənlərə tövbə etməyi vacib etmişdir. ALLAH ﷻ belə buyurur:

***"…Ey möminlər! Hamınız ALLAH`a tövbə edin ki, nicat tapasınız!"***[2]

***"...Bu, ayələri hikmət sahibi,*** (*hər şeydən*) ***agah olan*** (*ALLAH*) ***tərəfindən təsbit olunmuş, sonra da müfəssəl izah edilmiş bir Kitabdır ki, Siz ALLAH`dan başqasına ibadət etməyəsiniz. Mən sizi ALLAH tərəfindən*** (*Cəhənnəmlə*) ***qorxudan və*** (*Cənnətlə*) ***müjdələyənəm. Və RƏBB`inizdən bağışlanmağınızı dilə-***

---

1 əl-Buxari. Muslim.

2 ən-Nur surəsi, 24/31.

***yəsiniz. Sonra Ona tövbə edin ki, müəyyən bir müddət** (ömrünüzün sonunadək**) sizə yaxşı gün-güzəran versin və hər bir əməl sahibinə** (əməlinin**) mükafatını ehsan buyursun..."***[3]

Rəsulullah ﷺ belə buyurur:

*"Ey insanlar! ALLAH`a tövbə edin və Ondan bağışlanma diləyin. Şübhəsiz mən, gündə üz dəfə tövbə edirəm."*[4]

Tövbə, bəşərin nöqsanının və insanın qüsurunun şərtlərindəndir. İbadətlə məsul tutulan insan, ibadətində qüsurdan, səhvdən, qəflətdən, xətadan, unutqanlıqdan və günahdan uzaq olmaz. Buna görə Əbu Hureyrədən رضي الله عنه rəvayət edilən hədisdə Rəsulullah ﷺ belə buyurur:

*"Nəfsim əlində olan (ALLAH)`a and olsun ki, əgər siz günah etməsəydiniz ALLAH sizi götürüb, günah işləyən və ALLAH`dan bağışlanma*

3 Hud surəsi, 11/1-3.

4 Muslim.

*diləyən, buna görə onları bağışlayan bir cəmiyyət gətirərdi.”*[5]

Yenə Rəsulullah ﷺ belə buyurur:

*“Hamınız xəta edənsiniz, xəta edənlərin ən xeyirliləri tövbə edənlərdir.”*

ALLAH`ın ﷻ sifətlərəndən biri də, Ondan ﷻ bir kərəm və ehsan olaraq tövbəni qəbul etməsi və buna sevinməsidir. ALLAH ﷻ belə buyurur:

***“Bəndələrinin tövbəsini O qəbul edir, günahları O bağışlayır və sizin nə etdiyinizi də O bilir.”***[6]

***“Məgər onlar bilmirlər ki, ALLAH qullarından tövbə qəbul edər, sədəqə*** (zəkat***)***

---

5 Muslim.

6 əş-Şura surəsi, 42/25.

***alar və ALLAH tövbələri qəbul edəndir, rəhmlidir?!"***[7]

ALLAH`ın ﷻ gözəl isimləri, bu kainatda onların bir təsirinin olmasını labüd edir. "Tövbələri qəbul edən və çoxlu mərhəmət edən" ismi, tövbə edərək ALLAH`a ﷻ dönən və mərhəmət edilmiş bir məxluqu labüd edir. ALLAH`ın ﷻ bütün isimləri eyni şəkildə uca sifətlərini əhatə və onlara işarə edir, bu kainatda təsirlərini vacib edir. Qula düşən vəzifə, hər zaman ona vacib olan tövbəni yerinə yetirməsidir. Bu tövbəni qəbul edən, ona savab verən, əcrini böyüdən və onunla günahlarını bağışlayan ALLAH`dır ﷻ.

Tövbə, Nəbi və Rəsulların, ALLAH`ın ﷻ dostları möminlərin qulluq məqamlarından biridir. ALLAH ﷻ belə buyurur:

---

7 ət-Tövbə surəsi, 9/104.

***"Həqiqətən, İbrahim həlim xasiyyətli,* (*həmişə dua edərək*) *yalvarıb-yaxaran və özünü tamamilə* (*ALLAH`a*) *təslim etmiş bir zat idi."***[8]

***"ALLAH* (*müsəlmanlardan*) *bir qismini ürəyi* (*şəkk-şübhəyə düşüb Peyğəmbərdən və cihaddan*) *dömək üzrə ikən Peyğəmbərə, çətin saatda onun arxasında gedən mühacirlərə və ənsara tövbə nəsib etdi. Sonra da onların tövbələrini qəbul buyurdu* (*onları bağışladı*)*. Çünki O, həqiqətən, onlara qarşı çox şəfqətli, çox rəhimlidir."***[9]

ALLAH ﷻ, Musadan عليه السلام bəhs edərək belə buyurur:

***"…Ayılandan sonra isə: "Sən paksan, müqəddəssən!* (*Bütün eyib və nöqsanlardan uzaq-san!*) *Sənə* (*bu işimdən ötrü*) *tövbə etdim. Mən iman gətirənlərin birincisiyəm!" - dedi."***[10]

---

8 Hud surəsi, 11/75.
9 ət-Tövbə surəsi, 9/117.
10 əl-Ə`raf surəsi, 7/143.

ALLAH ﷻ tövbənin, cənnət qarşılığında RƏBB`lərinə canlarını və mallarını satan möminlərin sifətlərindən biri olduğunu zikr edir. ALLAH ﷻ belə buyurur:

***"...Etdiyiniz sövdəyə görə sevinin. Bu, böyük qurtuluşdur (****uğurdur****)! (****Onlar ALLAH`a****) tövbə, ibadət və şükür-səna edənlər, oruc tutanlar (****və ya cihad uğrunda, elm təhsil etmək üçün yurdundan ayrılıb başqa yerlərə gedənlər****), rüku və səcdə edənlər (****namaz qılanlar****), yaxşı işlər görməyi əmr edib pis işləri yasaq edənlər və ALLAH`ın hədlərini (****halal-haramı****) qoruyanlardır. (****Ya Rəsulum!****) Belə möminləri (****Cənnətlə****) müjdələ!"***[11]

Tövbənin bərəkəti tez və ya gec, gizli və ya aşkar olaraq görülür. Tövbənin qarşılığı, qəlblərin təmizlənməsi, günahların silinməsi və savabların çoxaldılmasıdır. ALLAH ﷻ belə buyurur:

---

11 ət-Tövbə surəsi, 9/111-112.

***"Ey iman gətirənlər! ALLAH`a səmimi-qəlbdən (*bir daha günaha qayıtmamaq şərtilə*) tövbə edin. Ola bilsin ki, RƏBB`iniz günahlarınızın üstünü örtsün və sizi (*ağacları*) altından çaylar axan cənnətlərə daxil etsin. O gün ALLAH Öz Peyğəmbərini və onunla birlikdə iman gətirənləri xəcil etməz. Onların (*iman*) nuru (*qıl körpüsü üstündə onlara yol göstərmək üçün*) önlərindən və sağ tərəflərindən axıb şölə saçarkən onlar belə deyəcəklər: "Ey RƏBB`imiz! Bizim nurumuzu tamam-kamal elə və bizi bağışla. Həqiqətən, Sən hər şeyə Qadirsən!"***[12]

Tövbənin qarşılığı, imanın, razılığın, hüzur və rahatlığın, qəlb sakitliyinin kölgələndirdiyi bir həyatdır. ALLAH ﷻ belə buyurur:

***"...Bu, ayələri hikmət sahibi, (*hər şeydən*) agah olan (*ALLAH*) tərəfindən təsbit olunmuş, sonra da müfəssəl izah edilmiş bir***

12 ət-Təhrim surəsi, 66/8.

***Kitabdır ki, Siz ALLAH`dan başqasına ibadət etməyəsiniz. Mən sizi ALLAH tərəfindən** (Cəhənnəmlə) **qorxudan və** (Cənnətlə) **müjdələyənəm. Və RƏBB`inizdən bağışlanmağınızı diləyəsiniz. Sonra Ona tövbə edin ki, müəyyən bir müddət** (ömrünüzün sonunadək) **sizə yaxşı gün-güzəran versin və hər bir əməl sahibinə** (əməlinin) **mükafatını ehsan buyursun..."***[13]

Tövbənin qarşılığı, göy üzündən enən və yer üzündən çıxan bərəkətlərdir. Mallarda bolluq, istehsalda və nəsildə bərəkət, bədənlərdə sağlamlıq və müsibətlərdən qorunmaqdır. ALLAH ﷻ, Huddan عليه السلام bəhs edərək belə buyurur:

***"(**Hud dedi ki:**) "Ey camaatım! RƏBB`inizdən bağışlanmanızı diləyin. Sonra Ona tövbə edin ki, göydən sizə bollu** (peydərpey) **yağış göndərsin, qüvvətinizin üstünə bir qüvvət də artırsın.** (Mənim dəvətimdən və imandan) **günahkar olaraq üz çevirməyin!"***[14]

---

13 Hud surəsi, 11/1-3.

14 Hud surəsi, 11/52.

İbn Abbas ﷺ, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Kim bağışlanma istəməyə daima davam edərsə, ALLAH onun üçün hər çətinlikdən bir çıxış, hər problemdən bir qurtuluş yaradar, onu gözləmədiyi yerdən ruziləndirər."*[15]

Bağışlanma diləmə (istiğfar) tövbə ilə birlikdə zikr edilməsə tövbəni də içinə alır və ona işarə edir. Tövbə qurtuluşdur. Hər arzulananı qazanmaq və hər çətinlikdən qurtulmaqdır. ALLAH ﷻ belə buyurur:

***"Tövbə edərək iman gətirib yaxşı işlər görənlərə gəldikdə isə, onların nicat tapmaları mümkündür."***[16]

ALLAH ﷻ, qullarının tövbə etməsini sevir. ALLAH ﷻ belə buyurur:

---

15 Əbu Davud.

16 əl-Qasas surəsi, 28/67.

***"... ALLAH*** *(günahından)* ***tövbə edənləri,*** *(təmiz və)* ***pak olanları sevər!"***[17]

ALLAH ﷻ, Ondan ﷻ bir ehsan və ikram olaraq, qulun tövbəsi ilə sevinir. Ənəs ibn Malik رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Şübhəsiz ALLAH, Ona tövbə etdiyi zaman qulunun tövbəsindən, sizdən birinizin (bu sevincindən) daha çox sevinir. Sizdən biriniz boş bir ərazidə minəyini itirir. Onun üstündə yeməyi və içməyi vardır. Ondan ümidini kəsir, bir ağacın yanına gəlir və kölgəsində uzanır. Minəyindən ümidini kəsmişdir. O bu halda ikən bir də görür ki; minəyi yanında durub. Onun yüyənindən tutur və sevincinin şiddətindən belə deyir: "ALLAH`ım! Sən mənim qulumsan, mən də sənin RƏBB`inəm!" Sevincindən səhv söyləyir."*[18]

---

17 əl-Bəqərə surəssi, 2/222.
18 Muslim.

ALLAH ﷻ, Ona ﷻ ən böyük şirki qoşan və Ona ﷻ qarşı çıxan: "İsa عليه السلام, ALLAH`ın oğludur" deyənləri belə tövbəyə çağırır. ALLAH ﷻ, onların söylədikləri bu sözdən ucadır. ALLAH ﷻ belə buyurur:

***"Məgər onlar ALLAH`a tövbə edib Ondan bağışlanmalarını istəməyəcəklər? Axı ALLAH Bağışlayandır, Mərhəmətlidir!"***[19]

Yenə, ALLAH`ın ﷻ ən pis qulları olan münafiqlərə də tövbə qapısını açmışdır. ALLAH ﷻ belə buyurur:

*"(Ya Rəsulum!)* ***Əlbəttə, münafiqlərin yeri Cəhənnəmin ən aşağı təbəqəsindədir. Sən heç vaxt onlara yardım edən tapmazsan! Tövbə edənlər, özlərini islah edib düzəldənlər, ALLAH`dan möhkəm yapışanlar və ALLAH qarşısında dinini*** *(etiqadını)* ***təmizləyənlər müstəsnadır. Çünki onlar möminlərə bərabər-***

---

19 əl-Maidə surəsi, 5/74.

***dirlər. Möminlərə isə ALLAH böyük mükafat verəcəkdir!"***[20]

Əbu Sə`id əl-Xudri رضي الله عنه, Rəsulullahın ﷺ onlara bunu xəbər verdiyini rəvayət edir:

*"Sizdən əvvəlkilərin içində yüz insanı öldürən bir adam vardı. Bir alimdən, onun üçün tövbənin olub-olmadığını soruşdu. Alim, "Bəli" dedi. Rəhmət mələkləri onun ruhunu aldılar və o adam bağışlandı."*[21]

Tövbənin mənası, ALLAH`a عز وجل dönmək, günahı tərk etmək və onu bəyənməmək, ibadətlərdəki səhlənkarlığına peşman olmaqdır. İmam ən-Nəvəvi رحمه الله belə deyir: "Hər cür günahdan tövbə vacibdir. Günah, qul ilə ALLAH عز وجل arasındadırsa və qul haqqı ilə əlaqəli deyilsə, tövbənin üç şərti vardır: Birincisi, günahı dərhal tərk etmək. İkincisi, etdiyinə peşman olmaq. Üçüncüsü, o günaha bir daha dönməməyə qəti qərar vermək. Bu

20 ən-Nisa surəsi, 4/145-146.

21 əl-Buxari. Muslim.

üçündən biri olmasa, qulun tövbəsi səhih olmaz. Günah, qul haqqı ilə əlaqəlidirsə, tövbənin dörd şərti vardır: Yuxardakı üç şərt və qul haqqından qurtulmaq. Bu haqq, mal və buna bənzər şeydirsə, onu sahibinə geri qaytarar. İftira cəzası və buna bənzər şeydirsə, bunun tətbiq edilməsinə icazə verər və ya bağışlamasını tələb edər. Qeybətdirsə, o şəxsdən, haqqını halal etməsini istəyər. Bütün günahlardan tövbə etməsi vacibdir. Əgər bir qismindən tövbə edərsə, o günahlardan tövbəsi səhih olar və digər günahlar üzərində qalar."

Tövbə edənlərin tövbələri və tövbələrinə səbəb olan hekayələri, qulaqlara zövq verir. Söhbətlər onlarla gözəlləşir və insanlar onlarla təsəlli tapır. Dostlar aralarında onlar haqda danışır. Onların hamısı yaxşıca düşünmüş, bəsirətlə baxmış və ömrünün keçən səhifələrinə nəzər etmişdir. Həyatının geri qalan hissəsini düşünmüş, ölümü və əziyyətini, qəbri və qaranlığını, siratı və sürüşkənliyini, Quran`ı və dəlilini, Rəsulullahın ﷺ

yolunu və sünnəsini xatırlamışdır. Bunun üzərinə qəlbində hidayət şimşəyi çaxmışdır. Ürəyində haqq günəşi doğmuşdur. Üzərindəki qəflət, istək, günah və həlak səbəblərinin qaranlığı dağılmış, ah çəkib inləməyə başlamış və qəlbi, keçmiş günlərdə səhlənkar davrandıqlarına peşmançılıqla dolmuşdur. Göz yaşları yağış kimi axmış, tükləri dik-dik olmuşdur. RAHMAN və RAHİM olan RƏBB`i-nin ﷻ qarşısında özünü atmışdır. ALLAH`a ﷻ belə yalvarır: "Sənə döndüm RƏBB`im!.. Peşman oldum!.. Tövbəmi qəbul et!.. Günahımı bağışla!.. Xətamı əfv et!.. Ey ALLAH`ım!.. Əgər məni qapından qovsan mənə kim sığınacaq verər?.. Əgər məni özündən uzaqlaşdırsan məni kim yaxılaşdırar?.." Bunun üzərinə ALLAH ﷻ, rəhməti ilə onun tövbəsini qəbul edər.

Biri, yol kəsməkdən tövbə etmişdir. Biri, zinadan tövbə etmişdir. Biri, içki içməkdən tövbə etmişdir. Biri, narkotik istifadə etməkdən tövbə etmişdir. Biri, qohumluq bağlarını qoparmaqdan tövbə etmişdir. Biri, namazı

tərk etməkdən və ya onu camaatla qılmamaqdan tövbə etmişdir. Biri, ana-ataya pis davranmaqdan tövbə etmişdir. Biri, faiz və rüşvət yeməkdən tövbə etmişdir. Biri, oğurluqdan tövbə etmişdir. Biri, siqaret çəkməkdən tövbə etmişdir. Hər cür günahdan ALLAH`a ﷻ dönən hər kəsə tövbələri mübarək olsun!.. Səmimi tövbə ilə insan, yenidən doğulmuş kimi olmuşdur. İnsanın həqiqi ömrü, ALLAH`a ﷻ itaət etdiyi zamandır. ALLAH`a ﷻ itaət etmədiyi zaman isə, ömründən deyildir.

Tövbə, hər an vacibdir. Fəqət, fəzilətli zamanlarda və məkanlarda, günahdan dərhal sonra, ibadətlərdən sonra, qırx yaşından sonra, tövbə etmədən ölməməsi üçün yatmazdan əvvəl və ömrün sonunda tövbə etmək daha güclü bir şəkildə vacibdir. ALLAH ﷻ belə buyurur:

***"Ey iman gətirənlər! Nə mal-dövlətiniz, nə də oğul-uşağınız sizi ALLAH`ın zikrindən yayındırmasın! Hər kəs bunu etsə (****ALLAH`ı yada salmasa****), belələri əsl ziyana uğrayanlardır. Biri-***

***nizin ölümü çatıb: "Ey RƏBB`im! Mənə bir az möhlət versəydin, sədəqə verib salehlərdən olardım! - deməmişdən əvvəl sizə verdiyim ruzidən (**ALLAH yolunda**) xərcləyin və (**bilin ki**) ALLAH əcəli çatan heç kəsə möhlət verməz. ALLAH sizin nə etdiklərinizdən xəbərdardır!"***[22]

ALLAH ﷻ, məni və sizi Uca Quran ilə bərəkətləndirsin...

Ehsanı üçün ALLAH`a həmd olsun. Müvəffəqiyyətli etməsi və nemətləndirməsi səbəbi ilə ALLAH`a şükürlər olsun. Şəhadət edirəm ki, ALLAH`dan başqa ibadətə və itaətə layiq haqq ilah yoxdur. Onun şanı ucadır. Şəhadət edirəm ki, Peyğəmbərimiz Muhəmməd Onun qulu və Rəsuludur. Onun rizasına dəvət edəndir. ALLAH`ım!.. Qulun və Rəsulun Muhəmmədə, əhli beytinə, əshabına və din qardaşlarına xeyir-dua və salam elə; onları bərəkətli et!..

---

22 əl-Munafiqun surəsi, 63/9-11.

Bundan sonra... Ey müsəlmanlar!.. ALLAH`dan layiqincə qorxun və möhkəm bir bağla İslama sarılın. RƏBB`inizi, Ona ﷻ ibadət edərək ucaldın.

ALLAH`ın qulları!.. RƏBB`iniz ﷻ belə buyurur:

*"(Tövbə edib)* ***RƏBB`inizə dönün. Əzab sizə gəlməmişdən əvvəl Ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz! Qəfil əzab özünüz də bilmədən başınızın üstünü almamışdan əvvəl RƏBB`inizdən sizə nazil edilmiş ən gözəl sözə*** *(Qurana)* ***tabe olun!*** *(Elə edin ki, sonradan)* ***bir kəs: "ALLAH`a itaət barəsində etdiyim təqsirlərə görə vay halıma! Həqiqətən, mən*** *(ALLAH`ın hökmlərinə, Qurana, Peyğəmbərə və möminlərə)* ***istehza edirdim!" - deməsin. Yaxud: "Əgər ALLAH məni doğru yola yönəltsəydi, mən mütləq müttəqilərdən olardım!" - söyləməsin. Və ya əzabı gördüyü zaman: "Kaş bir dəfə də*** *(dünyaya)* ***qayıda***

***biləydim; yaxşı işlər görənlərdən olardım!" - deməsin!"***[23]

İslam ümməti bu əsrdə, ağır fəlakətlər və arxa-arxaya gələn çətinliklərlə qarşı-qarşıya ikən, tövbəyə və ALLAH`a ﷻ dönməyə nə qədər də möhtacdır. Bununla, vəziyyətini düzəldər, RƏBB`inin ﷻ rəhməti enər, düşməninə qalib qələr və dininə dəstək olar. Müsəlmanlar üçün tövbədən və ALLAH`a ﷻ dönməkdən başqa, heç bir çətinlikdən çıxış yolu yoxdur. Qudsi hədisdə, ALLAH ﷻ belə buyurur:

***"Mən qulumun haqqımdakı zənnindəyəm. Kim məni öz nəfsində xatırlayarsa mən də onu öz nəfsimdə xatırlayaram. Kim məni bir cəmiyyətdə xatırlayarsa, mən də onu onlardan daha xeyirli bir cəmiyyətdə xatırlayaram. Mənə bir qarış yaxınlaşana mən bir***

23 əz-Zumər surəsi, 39/54-58.

***qulac yaxınlaşaram. Mənə gəzərək gələnə mən qaçaraq gələrəm."***[24]

ALLAH`ın qulları!.. İnsanların ən xeyirlisinə xeyir-dua və salam edin. Çünki bunu sizə ALLAH ﷻ əmr etmişdir. O ﷻ belə buyurur:

***"Həqiqətən, ALLAH və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər*** (*xeyir-dua verirlər*)***. Ey iman gətirənlər! Siz də ona salavat göndərib*** (*onun üçün salavat deyib*) ***layiqincə salamlayın!"***[25]

***Əli ibn Abdu`r-RAHMAN əl-HUZEYFİ***
***05/03/1423 Hicri – 17/05/2002 Miladi***

---

24 əl-Buxari.
25 əl-Əhzab surəsi, 33/56.